UOT: 551.4

# LƏNKƏRAN TƏBİİ VİLAYƏTİNİN LANDŞAFTLARI

**A.X. RƏCƏBLİ**
**Lənkəran Dövlət Universiteti**

*Məqalədə Lənkəran təbii vilayətinin landşaft tipləri, onları əmələ gətirən amillər (bitki örtüyü, torpaqlar, iqlim xüsusiyyətləri və s.) təhlil edilmişdir.*

***Açar sözlər:*** *landşaft, terrigen çöküntülər, allüvial, prolüvial, terras, kserofit.*

Lənkəran təbii vilayəti Azərbaycanın cənub-şərq hissəsində yerləşməklə, şərqdən Xəzər dənizi, qərbdən və cənubdan Talış dağlarının suayrıcısı, şimaldan Bolqarçayla məhdudlaşır. Cənubda və qərbdə təbii vilayətin sərhədi dövlət sərhədləri boyu keçir, şimalda və şimal-şərqdə Kür-Araz ovalığının Muğan və Salyan düzənlikləri ilə birləşir(Rafael). O, özünəməxsus relyef əmələgətirici amillər kompleksinə, neotektonik və morfostruktur xüsusiyyətlərə, iqlimə, hidroloji proseslərə malikdir.

Digər vilayətlərdən fərqli olaraq Talış dağlarının ətəklərində meşələr, onlardan yuxarıda isə dağ çölləri və kserofit kolluqlar kimi quraq landşaftları yayılmışdır. Bu, landşaft inversiyası adlanır. Alçaq dağlığın meşə landşaftı yüksəkliyə doğru dağ-kserofit landşaftına keçir. Düzənliklərin meşə-çəmən landşaft strukturunda iqlimin quraq keçməsi əsas rol oynayır. Lənkəran təbii vilayətinin aşağıdakı landşaft tipləri mövcuddur.

**Akkumlyativ düzənliklərin quru-çöl landşaftları** Lənkəran ovalığının şimal hissəsində şərqdən Xəzər dənizi, qərbdən Burovar silsiləsinin şimal-şərq dağətəyi, şimaldan və şimal-şərqdən Muğan və Salyan düzləri, cənubdan isə Viləşçayın dərəsinə qədər olan sahəni əhatə edir. Əsasən dördüncü dövrün allüvial, prolüvial və dəniz çöküntülərindən təşkil olunmuşdur.

Düzənliyin səthi müasir və qədim Xəzər terrasları, gətirmə konusları, terrigen çöküntülər, qədim çay dərələri ilə mürəkkəbləşmişdir [İsmayılov M.C., Yunusov M.İ. və b.].

İqlimi əsasən yayı quraq keçən mülayim-isti iqlim tipidir. Havanın orta illik temperaturu 14-14,5$^oC$, maksimum temperatur 37-38$^oC$, ən isti ayın orta temperaturu 26$^oC$, ən soyuq ayın orta temperaturu isə 1,5$^oC$-dir. Ümumi günəş radiasiyasının illik miqdarı 125 kkal/sm$^2$, radiasiya balansı isə 45-50 kkal/sm$^2$ olub, onun da 10-15 kkal/sm$^2$ buxarlanmaya sərf olunur. Rütubət çatışmazlığı isə 300-500 mm-ə bərabərdir. Yağıntıların əsas hissəsi yaz və payız aylarında düşür. Orta illik yığıntı 300 mm-dir.

Yayda şərq və cənub-şərq, qışda isə şimal və şimal-qərb küləkləri üstünlük təşkil edir. Çayları çox kiçik olub, əsasən yağış və yeraltı sularla qidalanır. Əsas çaylardan Bolqarçay, İncəçay, Göytəpəçay və s. göstərmək olar.

Ərazini təşkil edən süxurların litoloji tərkibindən və digər torpaq əmələ gətirən amillərdən asılı olaraq tünd və adi şabalıdı, gilli-qleyli, bataqlıq-çəmən, podzollu-qleylisarı torpaqlar yayılmışdır. Bitki örtüyü efemerlərdən, çəmən və müxtəlif otlardan, cənubda isə çox seyrək ağac və kolluqlardan ibarətdir. Hazırda quru-çöl landşaftları çox yerdə antropogen landşaftlarla əvəz edilmişdir.

**Yarımrütubətli subtropiklərin çəmən-kol landşaftları** Lənkəran düzənliyinin şimalında Viləş və Göytəpəçayları arası əraziləri, Mamusta, Rəzdəmeşə, Kakalos, Şiyəkəran, Giləkəran və Ərkivan kəndləri sahəsini əhatə edir. Bunlar, əsasən, qırılmış meşənin yerində formalaşmışdır. Ərazi şərqdə allüvial-dəniz, qərbdə isə prolüvial mənşəli düzənlikləri əhatə edir. Qərbdə düzənliyin səthi müxtəlif mənşəli dəniz terrasları ilə mürəkkəbləşərək çay dərələri, qobu və yarğanlarla daha çox parçalanmışdır [İsmayılov M.C., 1999]. Ərazinin qərbində terraslaşmış zəif maili düzənlikdə qobu-yarğan şəbəkəsinin sıxlığı 1-1,5 km/km$^2$ -ə qədərdir. Şərq istiqamətində çay dərələrinin dərinliyi 2-3 metr olub, bəzən daha da azalır. Prolüvial –delivüal dağətəyi düzənlikdə isə bu kəmiyyət 5-7 metrə qədər artır. Təngərü çayının düzənliyə çıxan yerində dərinlik 8-10, eni 200-300 m-ə çatır. Düzənliyin səthində yarğan və qobuların dərininə kəsimi 3- 5 mertdir. Əsas çay dərələri və yarğanların bəzi hissələrində şaquli parçalanma intensivliyinin artması nəticəsində qrunt suları səthə çıxır. Bu cür bulaqlara Viləşçayın gətirmə konusunda, Böyük Kotalan kəndi və Ərkivan qəsəbəsi yaxınlığındakı qobu və yarğanlarda müşahidə edilir.

Şimal istiqamətində iqlimin aridləşməsi nəticəsində təbii komponentlərlə yanaşı, landşaftın struktur-funksional xüsusiyyətlərində də dəyişiklik baş verir. Cənubdan şimala doğru atmosfer yağıntılarının miqdarı 1200-1300 mm-dən 600-800 mm-ə qədər azalır. Bu istiqamətdə buxarlanma artır, rütubətlənmə göstəricisi isə təqribən 0,45-dən 0,25-ə qədər azalır. Qrunt sularının səviyyəsi düzənliyin şərqində 1-3 m

arasında dəyişir. Cənubdan şimala doğru iqlimin aridləşməsi bitki örtüyündə, torpağın rütubətində, mexaniki və duz tərkibində əsaslı dəyişikliklər əmələ gəlir. Cənubda, əsasən, müxtəlifotlu mezofit və hidrofit çəmənliklər, hirkan narı, alçaq boylu əncir, böyürtkən və s. ağac və kolluqlar, şimalda müxtəlifotlu çəmənliklər, kserofitlərlə əvəz olunur.

Ərazinin şimalında müasir iqlim şəraiti çəmən-kol landşaftının inkişafı üçün əlverişlidir. Ovalığın cənub mərkəzi hissəsindəki çəmən-kol landşaftları isə əsasən meşədən sonrakı təkrar törəmə komplekslərdir. Onlar Şərəfə, Çaxırlı, Xıl, Xocavar və Qızılağac kəndləri sahəsində inkişaf etmişdir. Relyefi akkumlyativ düzənlik olub, Viləş, Bolqar, Göytəpə və Boradigah çaylarının qədim gətirmə konuslarına uyğun gəlir. Qərbdən şərqə doğru səthin meylliyi 3,5 m/km-dən 1,5 m/km-ə qədər azalır. Düzənlik dördüncü dövrün allüvial-prolüvial və dəniz çöküntülərindən təşkil olunmuşdur [Quliyeva S.Y., Kuçinskaya İ.Y. və b. 2014].

İqlim və qrunt sularının təsiri ilə əlverişli rütubətlənmə şəraiti burada allüvial-çəmən, qəhvəyi-çəmən, çəmən-bataqlıq torpaqlarını formalaşdırmışdır. Çəmən bitkiləri altında qələvi tərkibli allüvial-çəmən torpaqlar inkişaf etmişdir. Çəmən torpaqlarının üst horizontunda (A) humusun miqdarı 2-4,5% olub onun qalınlığı 10-15 sm-ə çatır. Ağır mexaniki tərkibli kəsəkli strukturludur.

Ərkivan qəsəbəsi, Musaküçə, Qızılavar kəndləri sahəsindəki çəmən landşaftları əvvəllər mövcud olmuş hirkan meşələri yerində formalaşmışdır. Bunu müasir çəmən landşaftında olan podzollaşmış sarı torpaqlar sübut edir. Meşələrin qırılması ərazinin bozqırlaşmasının intensivləşməsinə və landşaftın məhsuldarlığının azalmasına səbəb olmuşdur.

**Dağətəyi düzənliklərin və alçaq dağlığın rütubətli hirkan meşələri** Lənkəran vilayətində əsasən vulkanogen, vulkanogen-çökmə süxurlardan təşkil olunmuş dağətəyi və alçaqdağlıq sahələr sıx relikt hirkan meşələri ilə örtülmüşdür.

Hirkan meşələri şabalıdyarpaq palıd, məxməri ağcaqayın, dəmirağac, azat, şümşad,fısdıq, vələs kimi ağac və kollardan ibarətdir. Bu əsas ağac növləri əksər hallarda qarışıq meşə əmələ gətirir. Lakin ekogeomorfoloji şəraitin dəyişməsi ilə onlar alçaq dağlıq tirələrin suayrıcılarında palıd meşəliyi ilə əvəz olunur. Bu ağac növləri ilə yanaşı Lənkəran təbii vilayətinin alçaq dağlıq meşə landşaftında hirkan qarağacı, hirkan qovağı, göyrüş, azat ağacları, müxtəlif lianlar və kol bitkiləri yayılmışdır [Budaqov B.Ə.,1972].

Alçaqdağlığın hirkan meşəliyi 700-800 m-dən yuxarı qalxmır. Bu yüksəklikdən (700-800 m-dən) yuxarı alçaqdağlıq və orta dağlığın palıd-vələs meşə landşaftı yayılmışdır.

Lənkəran vilayətinin alçaqdağlıq meşə zonası və ona qovuşan düzənlik hirkan meşə kompleksləri Azərbaycanın başqa ərazilərindən fərqli olaraq özünəməxsus təbii, təbii-antropogen landşaftlar əmələ gətirir [ Budaqov B.Ə., Qəribov Y.Ə. 2000].

Talışda il ərzində ən çox yağıntı bu əraziyə düşür. Burada orta illik yağıntı 700-1800 mm, orta illik temperatur isə 11-13$^oC$-dir. Günəş radiasiyasının miqdarı 125-130 kkal/sm$^2$, radiasiya balansı 50-55 kkal/sm$^2$, buxarlanmaya sərf olunan istilik 35-40 kkal/sm$^2$, rütubət çatışmazlığı isə 100-200 mm-dir.

Podzollaşmış-sarı yuxa torpaq üzərində yaşıl lianlar, xurma ağacı, meşəaltı döşəmələrdə isə ayıdöşəyi, böyürtkən kolları, yuxarı dağ yamaclarında, xüsusilə qərb və şərq yamaclarda palıd, vələs, qarağac və qarışıq meşələr əsas yer tutur.

Düzənlik və dağətəyi ərazilərdə hirkan meşələrindən azad edilmiş sahələrdə sitrus meyvələri, çay plantasiyaları salınmış antropogen təsir nəticəsində təbii meşə landşaftları mədəni landşaftlarla əvəz olunmuşdur [ Müseyibov M.A., 1986 ].

Heyvanlar aləmi olduqca zəngindir.Burada dovşan, tülkü, çaqqal, oxlu kirpi, sincab, çöl donuzu, meşə dələsi, meşə pişiyi və s. heyvanlar yayılmışdır.

**Orta və qismən alçaq dağlığın meşə landşaftları** Talış dağlarında Peştəsər silsiləsinin şərq yamaclarını və Burovar silsiləsinin qərb yamacları arasındakı alçaq və orta dağlıq sahəni əhatə edir. Relyefi çox mürəkkəb geomorfoloji quruluşa malik struktur denudasion dağlıqdır.

Yayı quraq keçən mülayim isti iqlim tipi hakimdir. Orta illik temperatur 10-12$^oC$, mütləq maksimum temperatur 27$^oC$, minimum isə - 22$^oC$ təşkil edir. Ən isti ayın orta temperaturu 19$^oC$, ən soyuq ayın orta temperaturu isə 0$^oC$-dir.

Ümumi günəş radiasiyası 130-135kkal/sm$^2$, buxarlanmaya sərf olunan istilik isə 25-30 kkal/sm$^2$-dır. Rütubət çatışmazlığı isə 200-300 mm-ə bərabərdir.

Landşaft tipini əhatə etdiyi sahə bitki örtüyü ilə çox zəngindir. Ərazidə fiziki-çoğrafi şəraitin hündürlük qurşaqlarına görə dəyişməsindən asılı olaraq, bitki örtüyü də şaquli zonallıq qanuna uyğun olaraq yayılmışdır.

Aşağı dağlıq qurşaq üçün səciyyəvi olan hirkan meşələrində şərq və cənub-şərq yamaclarda dəmirağacı, şabalıq yarpaqlı palıd meşələri, qərb və şimal-qərb yamaclarda isə vələs, palıd ağaclarından ibarət meşələr inkişaf etmişdir. (İsmayılov M.C.Məmmədbəyov E.Ş., 2008).

Orta dağlıq üçün qalın və sıx fısdıq ağacı meşəlikləri səciyyəvidir. Bu qurşaqda meşəaltı bitkilər demək olar ki, çox zəif inkişaf etmişdir. Meşələrdə fısdıq ağaclarından başqa, şimal yamaclarda vələs-fısdıq, vələs-palıd ağacları inkişaf etmişdir.

Landşaft tipinin əhatə etdiyi sahədə vəhşi heyvanlardan nadıir hallarda ayı və bəbirə rast gəlmək olar. Bu heyvanlardan başqa, dağ meşələrində ən çox çöl donuzu, tülkü, çaqqal və canavar yaşayır.

Landşaft tipinin əhatə etdiyi sahə zəngin iqlim torpaq ehtiyatına malikdir. Vegetasiya dövründə illik fəal temperaturun cəmi kənd təsərrüfatı bitkilərinin, o cümlədən müxtəlif meyvələr, kartof, tütün, paxlalı bitkilər və taxılın (buğda) əkilməsi üçün şərait yaradır.

**Alçaq dağlığın meşə-çöl landşaftları** Lənkəran təbii vilayətinin şimal, şimal-qərb dağətəyi və alçaq dağlıq hissəsində yayılmışdır. Geomorfoloji quruluşuna görə ərazi denodasion-struktur dağətəyi və alçaq dağlıq sahələrdən ibarətdir. Burovar silsiləsi şimal-qərb qurtaracağında Bolqarçayla həmin silsilənin şərq yamacından axan kiçik çaylar arasında suayrıcı təşkil edir. Ərazinin orta hündürlüyü 400-600 m-dir.

İqlimi yayı quraq keçən mülayim-isti olub,ən soyuq ayın orta temperaturu - 3$^{o}$C, ən isti ayın orta temperaturuisə +22$^{o}$C-dən yuxarı olur. Yağıntılar əsasən payız aylarında müşahidə edilir. Günəş radiasiyasının illik miqdarı 130-135 kkal/sm$^2$ yaxındır. İl ərzində rütubət çatışmazlığı 200-300 mm-ə bərabərdir.

Ərazi bitki örtüyünə görə çox kasıbdır. Dağ yamaclarının aşağı hissəsində və ətəklərində çəmənli-bozqır bitkiləri, yuxarı dağ yamaclarında kserofitlər, qaratikan kolları ilə qarışmış, arid-seyrək meşələr yayılmışdır. Təbii landşaftlar antropogen landşaftlarla əvəz edildiyindən öz strukturunu ancaq kiçik sahələrdə saxlamışdır. Əsasən taxıl bitkiləri əkilir.

Bitki örtüyü və iqlim şəraitindən asılı olaraq burada tipik və yuyulmuş qəhvəyi dağ-meşə və dağ boz-qəhvəyi torpaqlar inkişaf etmişdir.

Burada tarla siçanı, qırmızı quyruq qum siçanı, boz dağ siçanı, məməlilərdən dovşan, tülkü, sarıqlı, safsar, porsuq, quşlardan torağay, çobanaldadan, tarla belbağlısı, sürünənlərdən tısbağa, kərtənkələ, qırmızıqarın təlxə və gürzə yayılmışdır.

**Orta dağlığın kserofit quru çöl landşaftları** Talış dağlarının qərb və şimal-şərqində, Talış və Peştəsər silsilələri arasındakı sahəni əhatə edir.

Talış və Peştəsər silsilələri arasında yerləşən sinklinalda çaylar geniş akkumlyativ relyef forması əmələ gətirmişdir.

Talış silsiləsinin şərq yamaclarında meyllilik 30-35 $^{o}$C olub, quru dərələrlə parçalanmışdır. Silsilənin qərb yamacları ekzogen proseslərin təsiri nəticəsinin aşınmaya məruz qalıb, çılpaq qayalıqlar, uçqun və qırıntı materialların əmələ gəlməsinə səbəb olmuşdur. Landşaft tipinin əhatə etdiyi sahənin digər xüsusiyyəti, sıldırım yamaclarla əhatə olunan və 2400-2500 m yüksəklikdə yerləşən hamarlanmış səthlərin inkişaf etməsidir. Ərazi geotektonik quruluşuna görə Astara antiklinorisinə uyğun gəlir. Pliosen və Eosen yaşlı vulkan mənşəli süxurlar geniş yayılmışdır.

İqlimi yayı quraq keçən soyuq dağ-çöl iqlimidir. Orta illik temperatur 5-7$^{o}$C, maksimum temperatur 20-25 $^{o}$C, mütləq minimum temperatur isə -25 $^{o}$C-dir. Ən isti ayın orta temperaturu 18 $^{o}$C, ən soyuq ay isə - 8 $^{o}$C-yə yaxındır.

Günəş radiasiyasının illik miqdarı 140-145 kkal/sm$^2$, illik buxarlanmaya sərf edilən istilik 10-15 kkal/sm$^2$, rütubət çatışmazlığı isə 300-500 mm-ə bərabərdir. İllik yağıntının miqdarı 300 mm-dən az, mümkün buxarlanma isə 500 mm-ə yaxındır.

Bitki örtüyü çox kasıbdır. Burada dağ kserofit bitkilərdən gəvən, akantolimonlar, poruğlar, yovşan və s. geniş yayılmışdır.

Çayətrafı sahələrdə və yaşayış məntəqələri ətrafında meyvə bağları, dağ yamaclarındakı münbit torpaqlarda isə taxıl əkilir. Əsasən dağ-şabalıdı torpaqlar inkişaf etmişdir. Antropogen landşaftlar zəif inkişaf etmişdir. Bunlar otlaq və biçənək kimi istifadə edilir.

## ƏDƏBİYYAT

1.Azərbaycan Respublikasının coğrafiyası. III cild. Regional coğrafiya. 2.Budaqov B.Ə., Qəribov Y.Ə. Təbii landşaftların antropogenləşməsinin əsas istiqamətləri. Azərbaycan Respublikasının konstruktiv coğrafiyası. Bakı, Elm, 2000.səh. 159-165. 3.Budaqov B.Ə., Mikayilov A.A. Landşaftın formalaşmasının və inkişafın əsas qanunauyğunluqları. Azərbaycan Respublikasının konstruktiv coğrafiyası. Bakı, Elm, 1996. 4.Qəribov Y.Ə. Azərbaycan Respublikasının təbii landşaftlarının optimallaşdırılması. Bakı 2012, 216 s. 5.Məmmədov Q.Ş Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları.Bakı. Elm, 2007.-664 s. 6..Məmmədov R.M., İsmayılov M.C. Azərbaycanda landşaftların təbii ehtiyyat potensialının qiymətləndirilməsi və ondan səmərəli istifadə edilməsi. ACC. Bakı 2013. 7..Məmmədova S.Z. Azərbaycanın Lənkəran vilayəti torpaqlarının ekoloji qiymətləndirilməsi və monitorinqi. Bakı . Elm, 2006.-372 s

### Ландшафты ленкоранского естественного региона

**А.Х. Раджабли**

В статье анализированы ландшафтные типы, факторы их образования (растительный покров, почвы, климатические условия и.д.) Ленкоранского естественного региона.

***Ключевые слова:*** *ландшафт, аллювиальный, пролювиальный, терригенные отложения, террас, ксерофит.*

### The landscapes of lankaran natural region

**A.Kh.Rajabli**

In the article, the landscape types of Lankaran natural region, factors that generate them (vegetation, soils, climatic characteristics, etc.) are analyzed.

***Key words:*** *landscape, alluvial, proluvial, terrigenic, terraces, xerophyte.*